**UOT 578.08**

# AZƏRBAYCANDA YAYILAN GÜLÜLCƏ (*LATHYRUS* L.) CİNSİ NÖVLƏRİNİN SƏMƏRƏLİ İSTİFADƏ PERSPEKTİVLƏRİ

**G. F. ALLAHVERDİYEVA**
**AMEA Genetik Ehtiyatlar İnstitutu**

*Məqalədə Azərbaycanda yayılan,kənd təsərrüfatı üçün əhəmiyyətli 12 gülülcə növünün bioloji xüsusiyyətləri tədqiq edilmişdir.Həmçinin, hər bir növün tərkibi, dərman və yem əhəmiyyəti qeyd edilmişdir.*

***Açar sözlər:*** *gülülcə, Azərbaycan, növ, cins, dərman, yem*

*Lathyrus* L. cinsi *Fabaceae* fəsiləsinin *Vicieae* (Adans.) tribasına aiddir. Tədqiqatçılar dünya üzrə yayılan *Lathyrus* L. cinsinin 170 növünü [11; 14] 12-13 seksiyaya ayırırlar [6; 7; 9; 12; 13]. Onların əksəriyyəti əsasən Aralıq dənizi regionunda mərkəzləşdirilmiş birillik və ya çoxillik bitkilərdir [12]. Bu cinsin Azərbaycanda yabanı halda *Orobus* L. cinsi ilə birlikdə 8 seksiya [12] üzrə 24 növünə [1; 2; 5] rast gəlinir.Bir növü isə kulturadadır *(L.odoratus). Əvvəllər* Azərbaycanda yayılan Gülülcə növlərindən beşi *Orobus* L. cinsinə aid edilmişdir [5], hazırda o müstəqil cins kimi qəbul olunmur və Gülülcə cinsinin tərkibində verilir [1; 2]. *Orobus* L. cinsi növlərində *Lathyrus* cinsi növlərindən fərqli olaraq yarpaqlar bığcıqsızdır, onun əvəzinə yarpağın sonunda çıxıntı əmələ gətirir. Bu əlamət hazırda *Orobus* seksiyasına aid edilən Gülülcə növlərini səciyyələndirən əsas əlamət kimi qəbul edilir [1; 2; 6; 7; 9].

Sitoloji tədqiqatlar göstərir ki, cinsin növlərində ( poliploidlər istisna olmaqla) diploid xromosom dəsti - 2n=14 saylıdır [10; 13; 16].

**Material və metodika.** Gülülcə növlərinə aid AMEA-nın Botanika İnstitunun Herbari Fondunda (BAK) və AMEA-nın Genetik Ehtiyatlar İnstitunun Herbari Fondunda (AGRİ) saxlanılan materiallar tədqiq olunmuş və geniş ədəbiyyat məlumatları təhlil edilmişdir. Tədqiqatda müqayisəli-morfoloji, botaniki-coğrafi, biomorfoloji, ekoloji, taksonomik, floristik-sistematik, fitosenoloji üsullardan istifadə olunmuşdur. Növlərin yayılması Azərbaycan florasında qəbul edilmiş rayonlaşma sxemi üzrə verilmişdir.

**Tədqiqatın nəticəsi və müzakirəsi.** *Lathyrus* L. növünün bitkiləri dünyanın bir çox ölkələrində iqtisadi və ekoloji cəhətdən əhəmiyyətli məhsullardır. Gülülcə (*Lathyrus* L.) paxlalı bitkilər arasında əsas qida tərkibinə görə ilk yerlərdən birini tutur. Protein tərkibi, əvəzedilməyən amin turşuları və yaşıl kütlədə karotin (26,0; 30,5 və 200 mq/kq-a qədər) digər paxlalılardan daha yüksəkdir. Toxumda zülal, lizin, arginin, triptofan və flavanoidlərin (rutin, kversetin, ononin, lüteolin) tərkibi müvafiq olaraq 38,0; 5,5; 7,05; 1,5 və 2,5% təşkil edir. Həmçinin, toxumlarının tərkibində çoxlu miqdarda kalium, kalsium, maqnezium, dəmir, mis, sink, manqan, fosfor, natrium, kobalt, nikel vardır[4].

Gülülcə cinsinin çoxillik növlərinin toxumunun tərkibi çoxlu miqdarda zülalın olması ilə xarakterizə olunur. Çoxillik növlər mal–qara, qoyun, donuzlar tərəfindən yaxşı yeyilir.

*Lathyrus* L. növləri qiymətli yem, dərman və dekorativ bitkiləridir. Quru otu heyvanlar tərəfindən yaxşı yeyilir. Ətirli gülülcə (*L. odoratus*) geniş istifadə olunan dekorativ bitkidir. Cinsin bəzi növləri balverəndir [5]. Çəmən gülülcəsi (*L. pratensis*)–dərman bitkisidir [3; 5].

**1. *L. sativus* L.–Əkin gülülcəsi.** Birillik, iy şəklində olan əsas kökü, çoxşaxəli gövdəli, 30-70 sm hündürlüyündə bitkidir.Yarpaq altlığı yarımoxvari, lansetvari, sivridir. Yarpaqları bir cüt yarpaqcıqdan ibarət olub, ucları şaxəli bığcıqlıdır. Kasacıq zəngşəkilli, tacı ağımtıl, göyümtül və ya çəhrayı olur. Paxla enli, uzunsov-rombşəkilli, yastı, samanı-sarı, 4-6 toxumludur. Toxumları iri, künclü, 7-10 mm uzunluqda, 5-9 mm enində, hamar, müxtəlif rənglidir. May–iyul aylarında çiçəkləyir, iyul – avqustda toxum verir [5].

**Yayılması:**AzərbaycandaBöyük Qafqazın şərq və Qubaətrafı hissəsində, Kiçik Qafqazın mərkəzi hissəsində, Lənkəranətrafı rayonlarda və arandan orta dağ qurşağına qədər rast gəlinir. Kolluqlarda, çay yataqlarında, alaq bitkisi kimi bostanlarda, arpa və buğda əkinlərində bitir.

**Əhəmiyyəti:***L. sativus* növündən yaşıl yem, quru ot (saman), dən və yaşıl gübrə əldə etmək məqsədilə becərilir. Əkin gülülcəsi balverəndir. Onun toxumunun və yaşıl kütləsinin məhsuldarlığı 3-42 t / ha –a çatır. Abiotik və biotik amillərə qarşı daha davamlı olduğu üçün seleksiyaçılar bu növdən daha çox istifadə edirlər. Əkin gülülcəsi təhlükəli həşəratlara, bir çox xəstəliklərə (göbələk, afanomiset) qarşı davamlıdır[4; 5].

Əkin gülülcəsi bitkisindənsənayedə - plastik və kazeinin alınmasında istifadə olunur.

*L. sativus* növünün toxumunun tərkibində 30% nişasta, 3% karbohidrat, 2% yağ vardır. Bu növün toxumundan sidikqovucu, immunitetin möhkəmləndirilməsində, epilepsiya və sarılıq xəstəliyinin müalicəsində istifadə edilir[8].

İribuynuzlu mal–qara və qoyunlar tərəfindən yaxşı, atlar tərəfindən isə nisbətən pis yeyilir. 1 hektardan 10-15 ton, bəzən daha çox yaşıl kütlə alınır. Protein və zülalla zəngindir. Tərkibində zülali maddələrin miqdarıçox olduğundan sulukarbonlarla zəngin olan qarğıdalı və sudanotu, sorqo və s. bitkilərlə əkilməsi məsləhətdir. Kulturadadır.

**2. *L. aphaca* L.–Yarpaqsız g.** Birillik çılpaq bitkidir. Gövdəsi nazik, sadə və ya şaxəli, (10) 15-40 (60) sm hündürlükdədir. Yarpaqaltlığı qarşılıqlı, gövdəyə sıxılmış, yumurtavari və ya üçkünc-yumurtavaridir. Yarpaqları 3-6 sm uzunluğunda nazik bığcığa çevrilmişdir. Kasacıq solğun yaşıl, tacı (7) 10-12 mm uzunluğundadır. Paxlası çılpaq, qəhvəyi, 5-7 toxumludur. Toxumu ovalvari, qəhvəyi və ya qara, 2,5–3 mm uzunluqdadır. May (aprel)–avqust aylarında çiçəkləyir, iyul-sentyabrdatoxum verir.

**Yayılması:**Azərbaycanda bütün rayonlarda yayılmışdır. Bu gülülcəyə düzənliklərdə, dağətəyində, aşağı və bəzən orta dağ qurşaqlarında təsadüf edilir. Bağlarda, dirriklərdə, çay və suvarma kanallarında, əkin sahələrində, kolluqlarda, meşə kənarlarında bitir. Qafqazda, Krım və Orta Asiyada yayılmışdır.

**Əhəmiyyəti:**Hindistanda kulturaya keçirilmişdir. Toxumu quşlar və heyvanlar tərəfindən yeyilir. Yarpaqsız gülülcənin yaşıl kütləsinin və toxumunun tərkibindəki zülal 21,6–30,5 % təşkil edir. Ona görə də, ondan donuz və ev heyvanlarının qidalanmasında istifadə olunur. Balverən bitkidir[5].

**3. *L. cicera* L.–Qırmızı g.**Birillik bitkidir. Gövdəsi (5) 15-30 (45) sm hündürlüyündədir. Yarpaqaltlığı yarımoxvari, uzunsov-lansetvaridir. Yarpaqları 1 cüt yarpaqcıqdan; yarpaqcıq lansetvari və ya xətvari-lansetvari, bığcıqları sivridir. Kasacıq zəngşəkilli, tacı al-qırmızı, 8-10 (15) mm uzunluqdadır. Paxlası enli xətvari, 3-5 toxumludur. Toxumları qəhvəyi, 4 mm-ə yaxın diametrdədir. Aprel, may–iyun aylarında çiçəkləyir, may–iyunda toxum verir.

**Yayılması:** Azərbaycanda bütün rayonlarda yayılmışdır. Meşələrdə, kolluqlarda, suvarma kanalları ətrafında, bağlarda, əkinlərdə və üzümlüklərdə bitir.

**Əhəmiyyəti:** *L. cicera*–nın toxumunun tərkibindəki zülal və digər komponentlər *L. sativus* –un tərkibi ilə oxşardır. Adətən qırmızı gülülcə taxıl və qarğıdalı bitkiləri ilə birgə becərilir.Yem kimi toxumu və yaşıl kütləsindən istifadə olunur. Kənd təsərrüfatı heyvanları tərəfindən yaxşı yeyilir. Balverən bitkidir[4; 5].

**4. *L. hirsutus* L.–Kələ-kötür g.**Birillik bitkidir. Gövdəsi (20) 30-80 sm hündürlüyündədir. Yarpaqaltlıqları yarımoxvari, lansetşəkilli və dar lansetşəkillidir. Yarpaqlar 1 cüt yarpaqcıqdan; yarpaqcıqlar lansetşəkilli, 1,5-6 (8) sm uzunluqda, 2,5-14 (17) mm enindədir. Kasacıq zəngşəkilli, tacı 10-15 mm uzunluqda, göy-bənövşəyidir. Paxla xətti, 5-6 toxumlu, uzun, ağ tükcüklü, qəhvəyidir. Toxumu şarşəkilli, palıdı, qırışlı-təpəli, 3,5 mm uzunluqdadır. May – iyun aylarında çiçəkləyir, iyul–avqustda toxum verir.

**Yayılması:** Azərbaycanda Lənkəranda, BQ-ın şərq və Quba hissəsində, Samur–Dəvəçi və Kür–Araz ovalıqlarında, Naxçıvan MR–da rast gəlinir. Kolluqlarda, meşə kənarlarında, əkin sahələrində bitir.

**Əhəmiyyəti:** Bu növün yarpaqları və kökü yeməli və qidalandırıcıdır. Mal–qara tərəfindən yeyilir. Bu növ də tərkibində zülal və proteinin yüksək olması ilə xarakterizə edilir[4; 5].

**5. *L. odoratus* L.–Ətirli g.** Birillik bitkidir. Gövdəsi dırmanan, 80-150 sm hündürlüyündədir. Yarpaqaltlığı yarımoxşəkilli, saplaqdan 2 dəfə qısadır. Yarpaq 1 cüt; yarpaqcıq uzunsov-ellipsşəkilli, küt, qısa iti uclu, 3,5-5,5 sm uzun-da, 15-20 mm enində. Çiçəkləri ətirlidir. Kasacıq kasaşəkilli, tacı iri, 20-30 mm uzunluqda, bənövşəyi və ya açıq-qırmızıdır. Paxlası uzunsov-xətvari, qısa, nahamar-tükcüklüdür. Toxumu tünd-palıdı, səthi hamardır. Dekorativ, gözəl və tünd iyli çiçəkli bitkidir.

**Yayılması:** BQ, Naxçıvan yayılmışdır.

**Əhəmiyyəti:** Bağlarda, parklarda becərilir[5; 8].

**6. *L. tuberosus* L.–Köküyumru g.** Çoxillik çılpaq bitkidir. Kökü nazik, kök yumruları nazik qalınlaşmış və ya az şarvari köklərdən ibarətdir. Gövdəsi nazik, sərilən və ya dırmanan, (20) 30-100 sm uzunluqdadır. Yarpaq altlığı yarımoxvari, lansetşəkillidir. Yarpaqları 1 cüt yarpaqcıqdan, yarpaqcıqlar uzunsov, az hallarda tərs lansetvari–uzunsov və ya enli tərs lansetvaridir. Kasacıq zəngşəkilli, tac 15-18 mm uzunluğunda, qırmızıdır. Çiçəkləri iylidir. Paxlası silindşəkilli, 2-6 toxumlu, çılpaq, qəhvəyi rənglidir. Toxumu ovalvari, tünd palıdı, səthi hamardır. İyun–iyul aylarında çiçəkləyir, iyul–avqustda meyvə verir.

**Yayılması:** BQ, Kür-Araz, Naxçıvanda rast gəlinir. Əkinlərdə, bağlarda, üzümlüklərdə, kolluqlarda bitir.

**Əhəmiyyəti:** Zülalla zəngin, yem əhəmiyyətli bitkidir. Kök yumrularında zülaldan əlavə, nişasta, şəkər və s. vardır. Mal – qara, atlar tərəfindən quru otu yeyilir. Kök yumruları yeyiləndir. Balverən bitkidir. İyli çiçəkli dekorativ bitkidir[4; 5; 8 ].

**7. *L. miniatus* Bieb. ex Stev.–Kiçik g.** Çoxillik çılpaq bitkidir. Gövdəsi düzduran və ya dırmanandır. Yarpaqaltlığı yarımoxvari, uzunsov-lansetvari yaxud

lansetvari, iti uclu, 2-3 dəfə saplaqdan qısadır. Yarpaqları 1 cüt; yarpaqcıqlar 3-6 (7) sm uzunluğunda, (1,5) 2-3 (4) sm enində, yumurtavari, enli yumurtavari və ya tərs yumurtavaridir. Kasacıq 7 mm uzun-da, zəngşəkilli, tacı 15-20 mm uzunluqda, açıq-qırmızıdır. Paxlası xətvari, çılpaq, qəhvəyi, 8-10 toxumludur. Toxumu dairəvi, tünd palıdı, 4-5 mm diametrdədir. May–iyul aylarında çiçəkləyir, (iyul) avqustda meyvə verir.

**Yayılması:** Azərbaycanda bütün rayonlarda yayılmışdır. Meşələrdə, kolluqlarda, meşə kənarında, tarlalarda, dağ çəmənlərində, əkin sahələrində alaq otu kimi bitir.

**Əhəmiyyəti:** Yem bitkisidir. Tərkibində 15%-ə qədər zülal vardır. Yarpaqlarında (mayda) 131,9 mq % vit. C vardır. Balverən bitkidir[4; 5].

**8. *L. pratensis* L.–Çəmən g.** Çoxillik saçaqlı bitkidir. Kökü nazik, budaqlı, atmalar əmələ gətirir. Gövdəsi düzduran, sərilən və ya dırmanan, (40) 55-100 sm hündürlüyündədir. Yarpaqaltlıqları iri, yarpaqcığı xatırladan, uzunsov və ya yumurtavari–lansetvaridir. Yarpaqlar 1 cüt; yarpaqcıqlar lansetvari və ya uzunsov- lansetvari, (1) 2-4 (5) sm uzunluğunda, 2,5-8 (10) mm enindədir. Kasacıq boruvari-zəngşəkilli, 7 mm uzunluqda; tacı parlaq və ya açıq-sarı, 12-17 mm uzunluğundadır. Paxlası qısa xətvari-lansetvari, qaramtıl, ağ, 6-10 toxumdan ibarətdir. Toxumu əyri dairəvi, hamar, nisbətən parlaq, qırmızı-palıdı, tünd ləkəlidir. İyun – iyul (avqust) aylarında çiçəkləyir, avqustda meyvə verir.

**Yayılması:** BQ, KQ, Kür – Araz, Talış, Naxçıvanda rast gəlinir. Meşələrdə, kolluqlarda, meşə kənarlarında, bağlarda, dağ çəmənlərində, tarlalarda və əkin sahələrində bitir.

**Əhəmiyyəti:** Tərkibində çoxlu midarda zülal var, əsasən vegetasiya və çiçəkləmə dövründə meyvə və yarpaqda zülal 19-28 % təşkil edir. Zülaldan başqa bitkinin yaşıl hissəsində 2,5% yağ, 51% lif, 22,4% azotsuz maddələr vardır. Çəmən gülülcəsinin yeraltı hissəsində karotin, vit. A, saponin, kempferol və kverçetin, mikroelementlər: P-0,260-0,264 %, Ca-1,15-1,21 %, Mg-0,186-0,210 %, K-1,74-2,55 %, Na-0,359-0,472 %, Si-0,400-0,446 %.100 q. təzə yarpaqda 58 -200 mq, quru yarpaqda isə 760 mq % vit. C vardır. Bundan başqa, bitkinin tərkibində acı maddələr də toplanır. Mal-qara tərəfindən az, atlar tərəfindən yaxşı yeyilir. Quru otu ev heyvanları,toxumu toyuqlar və göyərçinlər tərəfindən yaxşı yeyilir. Balverən bitkidir. Tibbdə bəlğəmgətirici kimi istifadə olunur[4; 5]. Kökündən həlim hazırlanır, hansı ki, ishal, ürəkdə ağrılar və yuxusuzluq zamanı istifadə olunur.

**9. *L. aureus* (Stev.) Brandza–Qızılı g.** Çoxillik 70 sm hündürlüyündə çılpaq bitkidir. Yarpaqaltlığı enli, yarımoxvaridir. Yarpaq qısa saplaqlı, 3–5 cüt yarpaqcıqlı; yarpaqcıq ellipsvari və ya uzunsov–ellipsvaridir. Kasacıq tükcüklü, enli zəngşəkilli; tac 15–20 mm uzunluqda, narıncı rənglidir. Paxla qonur və ya qaramtıl, uzunsov-xətvari, 6-12 toxumludur. Toxumun səthi hamardır. May–iyun aylarında çiçəkləyir.

**Yayılması:** Kiçik Qafqazın cənubunda rast gəlinir. Meşələrdə, meşə kənarlarında bitir.

**Əhəmiyyəti:**Quru otu mal–qara tərəfindən yeyilir[4].

**10. *L. sylvestris* L.–Meşə g.** Çoxillik bitkidir. Kökü uzun, sürünən, şaxəlidir. Gövdəsi uzun, şaxəli, 50-200 sm hündürlüyündə, düzqalxan və ya dırmanandır. Yarpaqaltlığı yarımoxşəkilli, lansetvari və ya dar lansetvaridir. Yarpaqlar 1 cüt, yarpaqcıqlar xətvari-lansetvaridir. Kasacıq zəngşəkilli; tac 15-20 mm uzunluqda, çəhrayı və ya tünd-qırmızıdır. Paxla xətvari, qısa, çılpaq, qəhvəyi, 10-15 toxumludur. Toxumu 4-7 mm uzunluqda, şarvari və ya uzunsov, səthi zəif qabarıqdır. İyun–avqust aylarında çiçəkləyir.

**Yayılması:** Azərbaycanda Böyük Qafqazın (BQ) qərbi, Quba dağ massivi, Kiçik Qafqazın (KQ) cənubu, Kür düzənliyi, Naxçıvanda təsadüf olunur. Meşələrdə, kolluqlarda və bağlarda bitir.

**Əhəmiyyəti:** Yem bitkisidir, tərkibində zülal və qida maddələri vardır. Yarpağında (çiçəkləmə vaxtı) 205-208 mq % vitamin C saxlayır. Təbii halda acı dada malik olduğuna görə pis, quru otu isə atlar tərəfindən yaxşı yeyilir. Balverən və dekorativ bitkidir[4; 5].

**11. *L. cyaneus* (Stev.)C. Koch–Mavi g.** Çoxillik bitkidir. Kökü nazikdir. Gövdəsi dırmanan, 15-35 (70) sm hündürlüyündədir. Yarpaq altlığı yarımoxşəkilli, lansetvari–xətvaridir. Yarpaqlar 1-2 cüt; yarpaqcıq xətvari–lansetvaridir. Kasacıq zəngşəkilli, tacı 15–20 (23) mm uzunluqda, göyümtül–bənövşəyidir. Paxla qəhvəyi, 4–4,5 sm hündürlüyündə, 5 mm enində, xətvaridir. İyun–iyul aylarında çiçəkləyir, avqust ayında meyvə verir.

**Yayılması:** Azərbaycanda Böyük Qafqazın şərq və Qubaətrafı hissəsində, Kiçik Qafqazın şimal və mərkəzi hissəsində, Naxçıvanda rast gəlinir. Çəmənliklərdə, qayalıqlarda, kolluqlarda, əkin sahələrində bitir.

**Əhəmiyyəti:**Yem bitkisidir.Atlar tərəfindən yeyilir. Tərkibində 22,2 % protein, 2,4 % yağ, 37% azotsuz birləşmələr vardır[4; 5].

**12. *L. vernus* (L.) Bernh.–Bahar g.** Çoxillikdir. Gövdəsi silindrşəkilli, 20–40 sm hündürlükdədir. Yarpaqlar 2-4 cüt yarpaqcıqlı; yarpaqcıq ovalvari, 3-7 sm uzunluqda, 1-4 sm enindədir. Kasacıq zəngşəkilli; tacı 15–18 mm uzunluqda, mavi və ya al–qırmızıdır. Paxla xətvari, qonur və ya qaramtıl, 8-10 toxumludur. Toxumu şarşəkilli,səthi hamardır. May–iyun aylarında çiçəkləyir.

**Yayılması:** Azərbaycanda Talışda rast gəlinir. Meşələrdə, kolluqlarda bitir.

**Əhəmiyyəti:** Balverən bitkidir. Ev heyvanları tərəfindən yeyilir.

Tərkibindəki mineral maddələr (N, K, P, Na, Ca) bitkinin həyatında böyük rol oynayır. Onlar hüceyrədə osmotik təzyiqin təmin edilməsində, biokimyəvi proseslərin idarə edilməsində və s. rol oynayır.

Yabanı flora yem bitkilərinin əhəmiyyətli dərəcədə genişləndirmək üçün tükənməz mənbələrdən ibarətdir. Ona görə də bu növlərin biologiyasının, ekologiyasının, yem əhəmiyyətinin, məhsuldarlığının, perspektiv növlərin areallarının və ekotiplərinin yerli istehsalda tam öyrənilməsinə ehtiyac vardır[4].

Kənd təsərrüfatı əhəmiyyətli 12 gülülcə növünə aid məlumatlar aşağıdakı cədvəldə qeyd edilmişdir.

**Cədvəl. Gülülcə növlərinin kənd təsərrüfatı əhəmiyyətli nümunələri**

| № | Növlər | Balverən | Dərman | Yem | Dekorativ |
|---|---|---|---|---|---|
| 1 | *L. sativus* | + | + | + | - |
| 2 | *L. aphaca* | + | - | + | - |
| 3 | *L. cicera* | + | - | + | - |
| 4 | *L. hirsutus* | - | - | + | - |
| 5 | *L. odoratus* | - | - | - | + |
| 6 | *L. tuberosus* | + | - | + | + |
| 7 | *L. miniatus* | + | - | + | - |
| 8 | *L. pratensis* | + | + | + | - |
| 9 | *L. aureus* | - | - | + | - |
| 10 | *L. sylvestris* | + | - | + | + |
| 11 | *L. cyaneus* | - | - | + | - |
| 12 | *L. vernus* | + | - | + | - |

## ƏDƏBİYYAT

**1.**Əsgərov A. M. Azərbaycan florasının konspekti. Bakı, 2011, 204 s.**2.**Əsgərov A. M. Azərbaycanın bitki aləmi. Bakı, TEAS PRES, 2016, 444 s.**3.**Hacıyev V. C.Azərbaycanın biçənək və otlaqlarının yem bitkiləri. Bakı, 1969, II c. 162 s.**4.**Вишнякова М. А., БурляеваМ. О. Потенциал хозяйственной ценности и перспективы использования Российских видов чины. Сельскохозяйственное биология, 2006, 6, с. 1-15.**5.**КарягинИ. И. Фл. Азербайджана. Род *Lathyrus* L. и *Orobus* L. Баку: АН Азерб ССР, 1954, т. V, с. 513-533.**6.**Чефранова З. В. Конспект рода *Lathyrus* L. Новостисист. высш. раст.,1971, 8: с. 191-202. **7.**Чефранова З.В.Чина – *Lathyrus* L. Флора европ. части СССР. Л: Изд-во Наука, 1987, т.VI, с.147-170. **8.**Güneş F.The ethnobotanical importance of some *Lathyrus* (*Fabaceae*) species // Proceedings of the IV$^{th}$ İnternational Congress of Ethnobotany, 2006, p. 585- 588. **9.**Asmussen C., Liston A.Chloroplast DNA characters, phylogeny and classification of *Lathyrus* (*Fabaceae*). Am J Bot, 1998, 85: p. 387-401. **10.**Badr S. F.Karyotype analysis and chromosome evolution in species of *Lathyrus* (*Fabaceae*). PJBS, 2007, 10 (1): p. 49-56. **11.**Kenicer G.An introduction to the genus *Lathyrus*L. Curtis's Bot Mag, 2008, 25(4):, p. 286-295. **12.**Kupicha E. K. The infragenetic structure of *Lathyrus.* Notes from the Royal Botanic Garden Edinburgh, 1983, 41: p. 209-244. **13.**Leht M. Phylogeny of Old World *Lathyrus* L. (*Fabaceae*) based on morphological data. FeddesRepert, 2009, 120(1-2): p. 59-74. **14.**Lewis G., Schrire B., Mackinder B., Lock M. Legumes of the World. Royal Botanic Gardens, Kew, 2005, 577 p.**15.**Shehadeh, A. A.Ecogeographic, genetic and taxonomic studies of the genus *Lathyrus* L. Doctoral thesus, University of Birmingham, 2011, 401p.**16.**Yamamoto K., T. Fujiware, L. D. Blumenreiett. Karyotypes and morphological characteristics of some species in the genus *Lathyrus* L. Japanese J. Breed., 1984, 34: p. 273- 284

### Перспективы эффективного использования рода Чины (*Lathyrus* L.) в Азербайджане

**Г. Ф. Аллахвердиева**

В статье рассматриваются биологические характеристики 12 видов чины, которые важны для распространения сельского хозяйства в Азербайджане.Также включены содержание каждого вида, важность лекарственного средства и корма.

***Ключевые слова:*** *Азербайджан, чина, вид,род, лекарственный, кормовой*

### Perspectives for the effective use of the genus *Lathyrus* L. in Azerbaijan

**G. F. Allahverdiyeva**

The article discusses the biological characteristics of 12 species of *Lathyrus*, which are important for the spread of agriculture in Azerbaijan.Also included are the content of each species, the importance of the medicinal and feed.

***Keywords:*** *Lathyrus, Azerbaijan, species, genus, medicinal, feed*

gunel.allahverdiyeva@yandex.ru